QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

Yanvar 2015
01 (1065)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı"nın təsdiq edilməsi haqqında

### Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın təsdiq edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli 13 nömrəli Sərəncamının 2.1-ci bəndinin icrasını təmin etmək məqsədi ilə, Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı" təsdiq edilsin (əlavə olunur).
2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 19 yanvar 2015-ci il.*

# 20 Yanvar - tariximizin faciə və qəhrəmanlıq səhifəsi

### ADPU-da 20 Yanvar faciəsinin iyirmi beşinci ildönümünə həsr edilmiş anım mərasimi keçirilib

***Yanvar ayının 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi Şəhidlər Xiyabanında Azərbaycanın azadlığı, ərazi toxunulmazlığı və milli dövlətçiliyi uğrunda şəhid olmuş soydaşlarımızın məzarlarını ziyarət edib, məzarları önünə gül dəstələri düzüb. Sonra "Heydər Əliyev məktəbinin lektoriyası"nda faciənin iyirmi beşinci ildönümünə həsr edilmiş anım mərasimi keçirilib. Anım mərasimində ilk olaraq şəhidlərin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.***

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov anım mərasimini giriş sözü ilə açaraq bildirib ki, bu günlər ölkəmizdə və dünyanın bir çox ölkələrində milli faciəmiz olan 20 Yanvar faciəsi ilə bağlı müxtəlif tədbirlər keçirilir. Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, akademik, hörmətli Ramiz Mehdiyevin müvafiq sərəncamı ilə ölkəmizdə «20 Yanvar faciəsinin iyirmi beşinci ildönümünün keçirilməsi ilə bağlı tədbirlər planı» təsdiq edilmişdir. Həmin sərəncamda respublikamızın bütün şəhər və rayonlarında, o cümlədən idarə və təşkilatlarda 20 Yanvar hadisələri ilə bağlı toplantı, konfrans və mühazirələrin təşkil edilməsi, mədəniyyət ocaqlarında faciəyə həsr olunmuş tamaşaların göstərilməsi, bədii və sənədli filmlərin nümayiş etdirilməsi, bu tədbirlərin kütləvi informasiya vasitələrində geniş işıqlandırılması, dünya ictimaiyyətinin diqqətini faciəyə yönəltmək məqsədi ilə Azərbaycanın xarici ölkələrdəki səfirlikləri, diplomatik nümayəndəlikləri və diaspor qurumları tərəfindən müvafiq tədbirlərin keçirilməsi, dünyanın aparıcı kütləvi informasiya vasitələrində, eləcə də televiziya kanallarında və İnternet şəbəkələrində 20 Yanvar faciəsi barədə materialların verilməsi nəzərdə tutulmuşdur. Eyni zamanda həmin sərəncamda 20 Yanvar hadisələri zamanı şəhid olanların ailələrinə humanitar yardımların verilməsi, Şəhidlər Xiyabanı ərazisində lazımi işlərin aparılması və Azərbaycanda təmsil olunan əsas dini konfessiya və qurumlar tərəfindən faciə qurbanlarının xatirəsinə həsr olunmuş dini mərasimlərin təşkil olunması öz əksini tapmışdır.

Qeyd olunanlarla yanaşı, paytaxt ictimaiyyətinin yanvarın 20-də Şəhidlər Xiyabanına ziyarəti təşkil ediləcək, saat 12:00-da ölkə ərazisində şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad ediləcək, gəmilər, avtomobillər və qatarlar səs siqnalları verəcək və gün ərzində Şəhidlər Xiyabanında matəm musiqisi səsləndiriləcəkdir. Həmin gün həm də respublikamızın şəhər və rayonlarında, kənd və qəsəbələrində matəm əlaməti olaraq və faciə qurbanlarının xatirəsini yad etmək məqsədilə dövlət bayraqları endiriləcəkdir. Artıq respublikamızda və bir çox xarici ölkələrdə 20 Yanvar faciəsinə həsr edilmiş müxtəlif tədbirlər həyata keçirilir və bu tədbirlərin davamlı olması nəzərdə tutulur.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, Təhsil naziri cənab Mikayıl Cabbarov yanvar ayının 6-da 20 Yanvar faciəsinin iyirmi beşinci ildönümünün qeyd edilməsi barədə əmr imzalamışdır. Həmin əmrə əsasən 20 Yanvar faciəsinin iyirmi beşinci ildönümünün keçirilməsi ilə əlaqədar Təhsil Nazirliyinin tədbirlər planı təsdiqlənmişdir. Tədbirlər planına uyğun olaraq bu ilin 6-20 yanvar tarixlərində bütün təhsil müəssisələrində azadlıq uğrunda şəhid olmuş soydaşlarımızın xatirəsinə həsr edilmiş geniş tədbirlərin keçirilməsi öz əksini tapmışdır.



Yuxarıda qeyd etdiyim sənədlərə əsasən yanvar ayının 13-də ADPU-da 20 Yanvar faciəsinin iyirmi beşinci ildönümünün keçirilməsi ilə əlaqədar tədbirlər planının təsdiq edilməsi barədə əmr imzalanıb. Həmin əmrdə 12-20 yanvar tarixlərində universitetimizin bütün fakültə və şöbələrində 20 Yanvar hadisələrinin səbəbləri, həmçinin həmin dövrdə xalqımıza qarşı xain mövqe tutmuş xarici və daxili qüvvələrin fəaliyyətinin təhlili, eləcə də tələbə-gənclər arasında vətənpərvərlik mövzusunda xüsusi söhbətlərin aparılması, xüsusi qəzetlərin, bülletenlərin buraxılması, stendlərin, guşələrin yaradılması və bu mövzuda mühazirələrin təşkil edilməsi göstərilmişdir. Bu gün bütün fakültələrdə 20 Yanvar faciəsinə həsr edilmiş xüsusi dərslər keçirilmiş, hadisələrin mahiyyəti və faciənin başvermə səbəbləri haqqında tələbə-gənclərə ətraflı məlumat verilmişdir. ADPU-nun Kompüter Mərkəzi faciənin ildönümü ərəfəsində universitetin İnternet şəbəkəsinə və saytına 20 Yanvar faciəsini əks etdirən materialları daxil etmişdir. Eyni zamanda universitetin müəllim və əməkdaşlarının respublika mətbuatında 20 Yanvar faciəsi ilə bağlı yazıları dərc edilmişdir. Bizim bugünkü anım mərasimimiz də şəhidlərimizin əziz və unudulmaz xatirəsinə olan böyük hörmət və ehtiramımızı özündə əks etdirir.




Rektor Y.Məmmədov yaxın tarixi keçmişimizə nəzər salaraq qeyd edib ki, xalqımızın 1988-ci ildə Dağlıq Qarabağ münaqişəsi ilə əlaqədar başlayan milli-azadlıq hərəkatı öz möhtəşəmliyi və prinsipiallığı ilə fərqlənirdi. Ölkəmizdə milli-azadlıq mücadiləsi Azərbaycanın ayrılmaz tərkib hissəsi olan Dağlıq Qarabağda baş qaldıran erməni separatizminə və qədim Türk torpaqları sayılan Qərbi Azərbaycandan 300 mindən çox soydaşımızın zorla öz ata-baba yurdlarından qovulmasına etiraz əlaməti olaraq keçirilən nümayiş və mitinqlərlə başladı. Xalqımız həmin nümayiş və mitinqlərdə keçmiş Sovetlər Birliyinin rəhbərliyindən və onun respublikamızdakı təmsilçilərindən ermənilərin qanunsuz hərəkətlərinə son qoyulmasını tələb edirdi. Lakin mərkəzi hakimiyyət ermənipərəst mövqe tutaraq, müxtəlif vasitələrlə bədxah və məkrli qonşularımızın qanunsuz hərəkətlərinin miqyasının genişlənməsinə rəvac verirdi.

Həmin dövrdə respublikamızda ictimai-siyasi vəziyyəti ağırlaşdıran amillər sırasında ölkə rəhbərliyində təmsil olunan şəxslərin səriştəsizliyi, milli maraqlara xəyanət etmələri, eləcə də böyük iddialarla yaşayan siyasi partiya təmsilçilərinin hadisələrin sonrakı gedişini düzgün proqnozlaşdıra bilməmələri də mühüm yer tuturdu. Respublikadakı belə özbaşınalıq və hərc-mərclik isə mərkəzi hakimiyyətə və onların Azərbaycandakı ətaltılarına Bakıda müxtəlif təxribatlar həyata keçirtmək üçün fürsət verdi.

1990-cı il yanvarın əvvəllərində keçmiş SSRİ-nin xüsusi xidmət orqanlarının əməkdaşları yerlərdəki emissarlarının yaxından köməkliyi ilə Bakıda müxtəlif iğtişaşlar törətdilər. Bu isə öz növbəsində M.Qorbaçov hakimiyyətinə Bakıya qoşun yeritmək üçün əsas verdi. 1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə keçmiş Sovet Ordusunun ən müasir döyüş texnikası ilə silahlanmış hissələri Bakıda çox dəhşətli və qanlı bir cinayət törətdilər. Öz hüquqlarının bərpası üçün küçə və meydanlara toplaşmış dinc mülki əhaliyə odlu silahlardan atəş açıldı, xalq güllə-baran edildi. Xüsusi təlim keçmiş əsgərlər, hətta qoca və uşaqlara belə rəhm etmirdilər. Nəticədə, həmin gecə 131 nəfər (bəzi mənbələrdə bu rəqəm 170 nəfər göstərilir) soydaşımız amansızcasına qətlə yetirildi, 700-dən çox adam yaralandı, 321 nəfər itkin düşdü, yüzlərlə insan həbs edildi. Onu da qeyd edim ki, universitetimiz milli müstəqilliyimiz və ərazi bütövlüyümüz uğrunda gedən mübarizədə 16 nəfər şəhid verib. Onlardan 2-si xüsusi şücaət və qəhrəmanlıqlarına görə ölümündən sonra Azərbaycanın Milli Qəhrəmanı adına (M.İbrahimov və M.Quliyev), 2-si isə «Azərbaycan Bayrağı» ordeninə (M.Məmmədov və M.Bayramov) layiq görülüb.

Sovet Ordusunun xüsusi təlim keçmiş hissələrinin Azərbaycanda törətdiyi cinayətlər yalnız Bakıda baş vermiş faciə ilə kifayətlənmirdi. Yanvarın 25-də və 26-da Neftçala və Lənkəranda bir sıra cəza tədbirləri həyata keçirildi və insanlar amansızlıqla qətlə yetirildilər. Digər tərəfdən, Azərbaycan informasiya blokadasına salınmışdı. Dəhşətli faciədən bir az öncə Azərbaycan Televiziyasının bloklarından biri partladılmışdı. Radio işləmirdi, qəzetlər nəşr edilmirdi. Həmin dövrdə Azərbaycan hakimiyyətində təmsil olunan simasız və satqın rəhbərlər isə baş vermiş faciə haqqında xalqa təhrif edilmiş məlumatların verilməsinə çalışırdılar. Məlumatsızlıq xalqı çaş-baş vəziyyətə salmışdı, insanlar nə edəcəklərini bilmirdilər. Eləcə də dünya ictimaiyyəti Azərbaycanda baş vermiş bu qanlı və məşum hadisədən xəbərsiz idi.

20 Yanvar hadisələri xalqımızın 1988-ci ildə başlanan milli-azadlıq hərəkatının kulminasiya nöqtəsi idi. Əslində, M.Qorbaçov Bakıya qoşun yeritməklə Azərbaycanda genişlənən milli-azadlıq hərəkatını boğmaq, insanlara divan tutmaqla isə digər xalqlara da dərs vermək məqsədini güdürdü. Lakin onun bu çirkin niyyəti baş tutmadı. 20 Yanvar hadisəsi xalqımızın, millətimizin iradəsini qıra bilmədi. Əksinə, bu qanlı faciə onun müstəqil milli dövlət qurmaq arzusunu daha da gücləndirdi və xalqımız bu çətin, eyni zamanda şərəfli və müqəddəs yolda inamla addımlayaraq öz müstəqilliyinə qovuşdu.

Belə ağır və müsibətli bir vaxtda xalqımızın vətənpərvər oğlu, ulu öndərimiz Heydər Əliyev müalicə olunduğu Barvixa xəstəxanasından çıxaraq təzyiq və təqiblərə məruz qalmasına baxmayaraq, yanvarın 21-də oğlu və silahdaşı cənab İlham Əliyevlə birgə Azərbaycanın Moskvadakı nümayəndəliyinə gələrək Sovet Ordusunun Bakıda törətdiyi bu qanlı cinayəti kəskin pisləyən bəyanat verdi və faciənin bütün günahkarlarının cəzalandırılmasını tələb etdi. Elə həmin gün ulu öndər Heydər Əliyev Azərbaycan KP MK, respublikanın Ali Soveti və Nazirlər Sovetinə teleqram göndərmişdir.

Rektor Y.Məmmədov çıxışının bu məqamında demişdir: "Bu, bəyanat və teleqramlar həmin ağır və çətin dövrdə insandan böyük cəsarət, hünər, mərdlik və vətənpərvərlik, millətsevərlik tələb edirdi. Lakin çox əfsuslar olsun ki, məlum səbəblər üzündən respublıika mətbuatı, radio, televiziya ürək ağrısı və milli təəssübkeşliklə yazılmış həmin bəyanat və teleqramları ictimaiyyətin diqqətinə çatdırmadı. Ancaq böyük vətənpərvər Heydər Əliyev bütün dünyaya sübut etdi ki, belə cəsarətli və prinsipial addımı yalnız Heydər Əliyev ata bilər. Əslində, Ulu Öndərimizin bu bəyanatı elə Azərbaycan xalqının haqq səsi idi. Bu bəyanat həm də faciədən sonra mənəvi-psixoloji cəhətdən sarsılmış xalqımıza böyük təsəlli olmaqla yanaşı, dünya ictimaiyyətinə Azərbaycanda baş vermiş faciənin miqyası barədə əsl həqiqətlərin lazımınca çatdırılmasında mühüm rol oynadı".

Rektor Y.Məmmədov 20 Yanvar faciəsindən danışarkən bu hadisəyə verilən hüquqi-siyasi qiymətə xüsusi toxundu. Qeyd etdi ki, bu faciəyə hüquqi-siyası qiymət ümummilli liderimiz Heydər Əliyevin Azərbaycanda xalqın təkidli tələbi ilə yenidən ali dövlət hakimiyyətinə qayıtmasından sonra verildi. Ulu öndərimiz Heydər Əliyev hələ Naxçıvan Muxtar Respublikası Ali Məclisinin sədri olarkən Azərbaycanın o vaxtkı riyakar və ikiüzlü rəhbərliyindən fərqli olaraq, 20 Yanvar hadisəsinə hüquqi-siyasi qiymətin verilməsi üçün böyük qətiyyət və prinsipiallıq nümayiş etdirmişdir. Belə ki, hələ 1990-cı il noyabr ayının 21-də böyük siyasi xadim Heydər Əliyevin rəhbərliyi ilə Naxçıvan Ali Məclisi 20 Yanvarın Milli Matəm günü kimi qeyd olunması haqqında qərar qəbul etdi. Bu əslində, həmin hadisəyə verilən ilk hüquqi-siyasi qiymət idi. Qərarda faciədə məsuliyyət daşıyan şəxslər adbaad göstərilir və onların birbaşa məsuiliyyət daşıdıqları qeyd olunurdu. Bundan başqa, ulu öndərimiz Heydər Əliyev Azərbaycan Respublikası Ali Sovetinin 1991-ci il 29 avqust tarixli sessiyasında böyük cəsarətlə bu hadisəyə konkret münasibət bildirərək demişdir: «Bu məsələnin həm siyasi tərəfi var, həm hüquqi tərəfi var. Bu məsələyə dərhal siyasi qiymət



(Davamı 2-ci səhifədə)

(Əvvəli 1-ci səhifədə)

# 20 Yanvar - tariximizin faciə və qəhrəmanlıq səhifəsi

vermək olardı. O ki qaldı hüquqi cəhəti, ayrı-ayrı adamların məsuliyyətə cəlb olunmaları, onu şübhəsiz ki, istintaq yolu ilə aydınlaşdırmaq lazımdır. Buna siyasi qiymət verilmədiyinə görə başqa tədbirlər həyata keçirmək mümkün olmur». Göründüyü kimi, 20 Yanvar faciəsinə obyektiv hüquqi-siyasi qiymətin verilməsi xalqımızın millətsevər oğlu Heydər Əliyevi həmişə narahat etmişdir. Elə buna görə də, 20 Yanvar faciəsinin hərtərəfli, əhatəli və dolğun qiyməti xalqımızın dahi oğlu Heydər Əliyevin müstəqil Azərbaycana rəhbərlik etdiyi dövrdə verildi. 1994-cü il yanvarın 5-də Ümummilli Liderimiz müvafiq sərəncam imzaladı ki, həmin sərəncamda da faciənin respublika miqyasında geniş araşdırılıb hüquqi-siyasi qiymət verilməsi tövsiyə olunurdu. 1994-cü il yanvarın 12-də isə ulu öndərimiz Heydər Əliyevin sədrliyi ilə 20 Yanvar faciəsinin beşinci ildönümü ilə bağlı tədbirlərin hazırlanması və keçirilməsi üzrə dövlət komisiyasının iclası keçirildi. Həmin tarixi iclasda çıxış edən müdrik rəhbərimiz Heydər Əliyev faciəyə tam və hərtərəfli hüquqi-siyasi qiymət verilməsinin vacibliyini xüsusi qeyd etdi.

Bu dövlət kommisiyasının ciddi və səmərəli fəaliyyəti nəticəsində elə həmin ilin mart ayının 29-da Milli Məclis «1990-cı il yanvarın 20-də Bakıda törədümiş faciəli hadisələr haqqında» qərar qəbul etdi. Həmin qərarda 20 Yanvar hadisəsi qabaqcadan şüurlu surətdə planlaşdırılmış və vəhşicəsinə həyata keçirilmiş cinayət aktı kimi qiymətləndirilir, faciənin günahkarları konkret adlarla göstərilirdi. Sənəddə qeyd olunurdu ki, Bakıya qoşun yeridilməsi milli-azadlıq hərəkatını boğmaq və kommunist rejimini saxlamaq məqsədini güdmüşdür. Əsas məqsəd xalq hərəkatına sarsıdıcı zərbə vurmaq, müstəqillik uğrunda mübarizə aparan qüvvələri məhv etməkdən ibarət olmuşdur.

Bir sözlə, yalnız ulu öndərimiz Heydər Əliyevin respublikamızda xalqın təkidli tələbi ilə yenidən ali siyasi hakimiyyətə qayıtmasından sonra 20 Yanvar faciəsinə obyektiv hüquqi-siyasi qiymət verilmişdir. Məhz Ümummilli Liderimizin müvafiq sərəncamı ilə 20 Yanvar ölkəmizdə ümumxalq hüzn günü kimi elan edilmişdir. Həmin gün Azərbaycanın müstəqilliyi və ərazi bütövlüyü uğrunda həlak olmuş şəhid soydaşlarımızın xatirəsi dövlət səviyyəsində böyük ehtiramla yad olunur.

Bütün bu məqamlarla bərabər, qeyd etmək istəyirəm ki, 20 Yanvar şəhidlərinin xatirəsini daim əziz tutan xalqımızın böyük oğlu Heydər Əliyev onların adlarının əbədiləşdirilməsi məqsədilə bir sıra sərəncamlar imzalamışdır. Bu baxımdan Ulu Öndərimizin 20 Yanvar faciəsi zamanı yüksək vətəndaşlıq nümunəsi göstərərək həlak olmuş vətəndaşlara «20 Yanvar şəhidi fəxri adı verilməsi haqqında» 17 mart 2000-ci il tarixli fərmanı və «1990-cı il 20 Yanvar hadisələri zamanı əlil olmuş şəxslərə dövlət qayğısının artırılması haqqında» 15 yanvar 2003-cü il tarixli sərəncamı həmin hörmət və ehtiramın bariz nümunəsi kimi qiymətləndirilir.

Ümummilli liderimiz Heydər Əliyev tərəfindən əsası qoyulmuş müdrik siyasi kursu çox uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev 20 Yanvar şəhidlərinin, əlillərinin və bütövlükdə bu qəbildən olan şəxslərin ailələrinə dövlət səviyyəsində qayğı və köməkliyin göstərilməsi və onların sosial müdafiəsinin gücləndirilməsi üçün bütün lazımi tədbirləri həyata keçirir. Öz milli dövlətçiliyini yenidən bərpa etmiş respublikamızda ölkəmizin suverenliyi və ərazi bütövlüyü uğrunda şəhid olmuş qəhrəman Azərbaycan övladlarının xatirəsinin əbədiləşdirilməsi üçün dövlət səviyyəsində mühüm işlər görülmüş, bütün bölgələrimizdə şəhidlərin xatirəsinə abidə-komplekslər ucaldılmışdır. Bütün bunlar xalqımızın və dövlətimizin 20 Yanvar faciəsi zamanı həlak olmuş şəhid soydaşlarımızın ruhuna bəslədiyi böyük hörmət və ehtiramın parlaq nümunəsidir.



Rektor Y.Məmmədov çıxışının sonunda bildirib ki, XX əsr xalqımızın tarixinə, taleyinə həm qanlı fəlakət və faciələrlə, eyni zamanda həm də qəhrəmanlıqlarla dolu olan bir dövr kimi daxil olmuşdur. 20 Yanvar hadisələrini biz həm faciə, həm də qəhrəmanlıq kimi səciyyələndiririk. XX yüzillik bizim üçün həm də bir həyat dərsi olmalıdır. Səbəbi aydındır: Azərbaycanın torpaqlarının 20 faizindən çoxu təcavüzkar Ermənistan tərəfindən işğal edilib, 1 milyondan çox soydaşımız öz tarixi ata-baba yurdundan didərgin düşüb, 20 mindən çox soydaşımız həlak olub, 50 mindən çox vətəndaşımız isə əlil olub. Müharibə hərbi müstəvidən diplomatiya müstəvisinə, informasiya müstəvisinə keçmişdir. Yeri gəlmişkən, beynəlxalq ictimaiyyət bu gün Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həllinə də ikili standartlardan yanaşır. Bu ikili standartlar üzündən və eyni zamanda işğalçı Ermənistanın qeyri-konstruktiv mövqeyi səbəbindən Birləşmiş Millətlər Təşkilatı Təhlükəsizlik Şurasının münaqişənin sülh yolu ilə həllinə dair qəbul etdiyi 4 qətnamə bugünədək icra edilməyib.

Dövlət başçımız cənab İlham Əliyev Azərbaycan həqiqətlərinin dünya ictimaiyyətinə üçün çox səmərəli və uzaqgörən siyasət həyata keçirir. Həmçinin ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, YAP-ın Sədr müavini Mehriban Əliyeva və Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyeva Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi barədə həqiqətlərin bütün dünya ictimaiyyətinə lazımınca çatdırılması üçün böyük əzmlə, fədakarlıqla çalışırlar. Hazırda Azərbaycanın xaricdə 453 diaspor təşkilatı fəaliyyət göstərir və bu diaspor təşkilatlarımız da Azərbaycan həqiqətlərinin beynəlxalq ictimaiyyətə çatdırılması üçün xaricdə səmərəli fəaliyyət göstərirlər. Biz tələbə-gənclərə müasir dünyamızda cərəyan edən ictimai-siyasi proseslərin əsl mahiyyətini tam və dolğun çatdırmalı, onları sağlam düşüncəli vətəndaş kimi yetişdirməliyik.

Anım mərasimində Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mais Əmrahov "20 Yanvar - qan yaddaşı" mövzusunda məruzə ilə çıxış edib. Professor M.Əmrahov öz maraqlı və məzmunlu məruzəsində bildirib ki, hər bir xalqın tarixində həm faciəli səhifələr, həm də qəhrəmanlıq səhifələri olur. Çox nadir hallarda bu iki məqam ust-ustə duşur. 1990-cı ilin 20 Yanvarında bu iki məqam üst-üstə düşdü, Azərbaycan xalqı sınağa çəkildi və bu sınaqdan şərəflə çıxdı. Professor M.Əmrahov qeyd edib ki, 1990-cı il yanvarın 19-da Mixail Qorbaçov SSRİ Konstitusiyasının 119-cu və Azərbaycan SSRİ Konstitusiyasının 71-ci maddələrini kobud şəkildə pozaraq, yanvarın 20-dən Bakıda fövqəladə vəziyyət elan edilməsi haqqında fərman imzaladı.

SSRİ Müdafiə Nazirliyinin, DİN-in və DTK-nın hazırlayıb həyata keçirdiyi «Udar» adlı əməliyyatda əsas rolu xüsusi təyinatlı «ALFA» və SSRİ DTK-nın «A» təxribat qrupları oynayırdı. SSRİ DTK-nın «Alfa» qrupu yanvarın 19-da saat 19.27-də Azərbaycan Televiziyasının enerji blokunu partlatdı, respublikada televiziya verilişləri dayandırıldı. Mətbuat susduruldu, Azərbaycan dünyadan təcrid edildi.

Fovqəladə vəziyyətin yanvarın 20-də saat 00:00-da tətbiq edilməsinə baxmayaraq, qoşun hissələri yanvarın 19-da saat 21-dən etibarən birinci olaraq Turkan-Qala tərəfdən şəhərə yeridildi. «Bakı əməliyyatı» na rəhbərliyi birbaşa SSRİ Mudafiə naziri Dimitri Yazov, SSRİ Daxili işlər naziri Vadim Bakatin, SSRİ DTK-sı sədrinin muavini Filip Babkov həyata keçirirdilər.

Bakı qarnizonunun qoşunları, gətirilən hərbi hissələr, hərbi gəmilərdən çıxarılan desant qrupları şəhər üzərinə hücuma keçdilər. Ağır hərbi texnika çox asanlıqla barrikadaları dağıtdı. Şəhərin küçələri güllələnmiş və yaralanmış gunahsız



adamların - qocaların, qadınların, uşaqların qanına qərq olmuşdu. Hərbcilər təsadüfən küçəyə çıxanları, yaşayış evlərini, təcili tibbi yardım maşınlarını atəşə tutur, yaralıları öldürür, meyitləri yandırır, təhqir edir, eybəcər hala salırdılar. Adamları ağır hərbi texnikanın tırtılları altına salır, əzabla öldürürdülər.

Bakıya yeridilən qoşun hissələri qapalı duşərgələrdə saxlanılırdı. Onlarla əhali ilə ünsiyyətdə olmağa imkan verilmirdi ki, xalqın əliyalın olmasından xəbərdar olsunlar. Bakıya yeridilən əsgər və zabitlərə demişdilər ki, «islam fundamentalistləri», «pantürkistlər» Azərbaycanda Sovet hakimiyyətini ələ keciriblər, ona görə də onları məhv etmək lazımdır. Məhz azərbaycanlılara qarşı nifrət hissi ilə koklənən, spirtli içkilər vasitəsilə qızışdırılaraq, şəhərə hücum edən əsgər və zabitlər qadına, qocaya, körpəyə, hətta təcili tibbi yardım maşınlarının sürücülərinə və həkimlərə fərq qoymadan atəş açmış, onları vəhşicəsinə qətlə yetirmişdilər. Tanklar və BTR-lər içi insanlarla dolu minik maşınlarını əzib kecirdilər. Xəstəxanaların işıqlarını kəsmişdilər ki, yaralılara tibbi yardım göstərmək mümkun olmasın. Fövqəladə vəziyyətin tətbiqi əhaliyə elan olunanadək hərbi qulluqçular 82 nəfəri amansızcasına qətlə yetirmiş, 20 nəfəri ölümcül yaralamışdılar.

Fovqəladə vəziyyət elan edildikdən sonra da, yanvarın 20-də və sonrakı günlərdə Bakı şəhərində daha 57 nəfər öldürülmüşdür.

Beləliklə, qoşunların qanunsuz yeridilməsi nəticəsində Bakıda və respublikanın rayonlarında 147 nəfər öldürülmüş, 744 nəfər yaralanmış, 841 nəfər qanunsuz həbs olunmuş, onlardan 112 nəfəri SSRİ-nin müxtəlif şəhərlərinə aparılaraq həbsxanalarda saxlanılmışdı. Hərbi qulluqçular tərəfindən 200 ev və mənzil, 80 avtomaşın, o cümlədən təcili tibbi yardım maşınları dağıdılmış, yandırıcı gullələrin torətdiyi yanğınlar nəticəsində külli miqdarda dövlət əmlakı və şəxsi əmlak məhv edilmişdir. Dövlət, ictimai və şəxsi əmlaka həmin dövrün qiymətləri ilə 5.637.286 rubl miqdarında maddi ziyan vurulmuşdur.

Qabaqcadan düşünülüb hazırlanmış bu təcavüzkarlıq aksiyası xalqımızın demokratiya və milli azadlıq uğrunda mubarizəsini boğmaq, xalqı təhqir edərək ona mənəvi zərbə vurmaq məqsədi daşımışdır. Amma bütün bunlar nəinki xalqımızın gözünü qorxutdu, əksinə, onun Sovet imperiyasına qarşı nifrətini qat-qat artırdı. Xalq avtomat süngülərinin, tank lülələrinin ona tuşlanmasından qorxmayıb öz şəhidlərini küçə və meydanlardan topladı. Topun-tüfəngin hər küçədə, hər tində qoyulmasına, fövqəladə vəziyyət rejiminə baxmayaraq, yanvarın 22-də xalq öz şəhidlərini Azadlıq meydanından son mənzilə - Şəhidlər Xiyabanına yola saldı.

Ötən əsrin sonlarından millətimizin başına gələn fəlakətlər, üzləşdiyimiz ağrı-acılar, şəhidlik, qaçqınlıq, köçkünlük, Qarabağ dərdi, Vətən həsrəti ədəbiyyatımıza da öz təsirini göstərdi. Yazıçı və şairlərimiz bir-birinin səsini, harayını tamamlayan, eyni ağrını, eyni dərdi özlərinə məxsus sözlə poeziyamızda, nəsrimizdə naxışladılar. Xalq şairi Bəxtiyar Vahabzadənin dediyi kimi:

***İnsan, insan olur öz hünəriylə,***
***Millət, millət olur xeyri, şəriylə.***
***Torpağın bağrına cəsədləriylə,***
***Azadlıq tumunu əkdi şəhidlər.***

Müasir Azərbaycan bu gün sürətlə inkişaf edir. Bu inkişafa mane olan yeganə əngəl isə Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həll olunmamasıdır. Müasir dövrün siyasi hadisələrini izlədikdə aydın olur ki, yaxın və uzaq müttəfiqlərimiz bu problemin həlli istiqamətində heç bir əsaslı iş görmək fikrində deyillər. ATƏT-in və digər beynəlxalq qurumların fəaliyyəti siyasi manevrləri xatırladır. Xalqımız müharibə istəmir. Münaqişənin sülh yolu ilə həlli istiqamətində ümummilli lider Heydər Əliyev tərəfindən atılan mühüm addımlar, onun siyasi kursunu uğurla davam etdirən Azərbaycan Prezidenti cənab İlham Əliyevin münaqişənin sülh yolu ilə həll edilməsi sahəsindəki fəaliyyəti xalqımız tərəfindən bəyənilir və dəstəklənir. Ancaq dövlət başçımızın dəfələrlə xatırlatdığı kimi, münaqişə ancaq ölkəmizin ərazi bütövlüyü, suverenliyi əsasında həll edilə bilər. Yurd-yuvalarından didərgin salınmış soydaşlarımız yerlərinə qayıtmalı, ata-baba torpaqlarının sahibi olmalıdırlar.

Azərbaycan Prezidenti İlham Əliyev Nazirlər Kabinetinin 2014-cü ilin sosial-iqtisadi inkişafı yekunlarına və 2015-ci ildə qarşıda duran vəzifələrin müzakirəsinə həsr edilmiş iclasında Qərb dövlətlərinə üzünü tutaraq ikili yanaşmaya son qoymalarını tələb etmişdir.

1990-cı ilin 20 Yanvarı elə şanlı tarixdir ki, illər, əsrlər ötsə də, bu gün heç vaxt unudulmayacaq, yaddaşlardan silinməyəcəkdir. Xalqımıza qarşı bu bəşəri cinayəti törədənlər isə həmişə lənətlənəcəklər. Allah bütün şəhidlərimizə rəhmət eləsin!

Anım mərasimində ADPU-nun dosenti, şair, Əməkdar müəllim Oqtay Rza "Vətən, daha yas saxlama!" adlı şeirini oxuyub.

**Mənsur İBRAHİMLİ,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü,**
**Gülnar BƏXTİYARQIZI,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü**

# İmtahan sessiyası obyektiv və şəffaf keçirildi

İlk olaraq onu qeyd edək ki, Azərbaycan Respublikasının Təhsil naziri cənab Mikayıl Cabbarov 2014-cü il dekabr ayının 4-də "İmtahan sessiyasının təşkili və keçirilməsi barədə" müvafiq əmr imzalamışdır. Həmin əmrdə ali təhsil müəssisələrində 2014-2015-ci tədris ilinin payız semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin edilməsi, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, ali təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması və bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb lazımi tədbir görülməsi, həmçinin imtahanlarda ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması öz əksini tapmışdır. Eyni zamanda Təhsil nazirinin həmin əmrində 2015-ci ildə Bakı şəhərində ilk Avropa Oyunlarının keçirilməsi ilə əlaqədar olaraq ali təhsil müəssisələrində payız semestrinin imtahan sessiyasının 29 dekabr 2014-cü il tarixindən başlanması və 18 yanvar 2015-ci il tarixində sona çatdırılması müəyyən edilmişdir.

Təhsil nazirinin bu əmrindən irəli gələn vəzifələrin yerinə yetirilməsi məqsədilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov dekabr ayının 5-də 3/345 saylı əmr imzalamışdır. Rektor Y.Məmmədovun həmin əmrinə əsasən universitetdə 11 nəfərdən ibarət imtahan qərargahı yaradılmışdır. İmtahan qərargahının sədri Mexanika və molekulyar fizika kafedrasının müdiri, professor Edil Eyvazov, müavini Funksiyalar nəzəriyyəsi kafedrasının müdiri, professor Rəhim Rzayev, katibi isə Analitik və fiziki kimya fakültəsinin dosenti Azər Sərdarlıdır. İmtahan qərargahının tərkibinə universitetin Elmi katibi, dosent Laçın Həsənova, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayev, Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müdiri, professor Əzizxan Tanrıverdiyev, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, dosent Rəcəb Əliyev, Əcnəbi tələbələrin işi üzrə fakültənin dekanı, dosent Nurəddin Uluxanlı, Botanika kafedrasının müdiri, dosent Anaxanım Yusifova, Xarci dillər kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva daxil edilmişlər.



Qeyd edək ki, imtahan qərargahının fəaliyyət dairəsinə semestr dövründə imtahanların təşkili və keçirilməsinə nəzarət etmək, imtahanların təşkili və imtahan prosesi zamanı yarana biləcək mümkün mübahisəli vəziyyətlərlə bağlı daxil olmuş müraciətləri vaxtında araşdırıb müvafiq qərarlar qəbul etmək, akademik borcların ləğvində, həmçinin imtahanlarda tələbələrin biliyinin qiymətləndirilməsində obyektivliyi və şəffaflığı təmin etmək kimi mühüm məsələlər aiddir. İmtahandan aldığı qiymətlə razılaşmayan tələbələr isə fakültələr və universitet üzrə yaradılmış münaqişə komissiyalarına, həmçinin qərargaha müraciət edirlər. Qərargahın normal fəaliyyəti üçün ayrılmış iş otağına telefon xətti çəkilmiş, növbətçilik cədvəli yaradılmışdır. Qərargah üzvləri mütəmadi şəkildə imtahan zallarında olur, onlara ünvanlanan müraciət və təkilflərlə bağlı müvafiq qeydlər aparırlar. Bundan əlavə, universitetdə valideynlərlə əlaqələrin yaradılmasına da xüsusi diqqət yetirilir ki, bu da onlarda imtahanların gedişi barədə dolğun təsəvvürün formalaşdırılmasına xidmət edir. Qərargah üzvləri tərəfindən hər hansı müraciətin araşdırılması və qəbul olunmuş qərar qarşı tərəfi qane etmədikdə və ya müraciətlər komissiya üzvlərinin səlahiyyətlərinə aid olmadıqda rektorluğa müraciət edilir və narazı tərəfin iştirakı ilə məsələyə baxılır. İmtahan qərargahının əlaqə telefonları (012) 408-30-29 və (012) 498-17-94-dür. Eyni zamanda imtahanların keçirilməsinə nəzarəti təmin etmək məqsədilə imtahan rəhbərləri və nəzarətçi-müəllimlər təyin edilmişdir.



İmtahan qərargahının rəhbəri, professor Edil Eyvazovun verdiyi məlumata görə, universitetdə 11 fakültə üzrə əcnəbilər də daxil olmaqla ali təhsilin bakalavriat pilləsində əyani şöbədə 6861 nəfər tələbə, qiyabi şöbədə isə 8 ixtisas üzrə 1511 nəfər tələbə, həmçinin magistratura pilləsində əyani şöbədə 602 magistr, qiyabi şöbədə isə 283 magistr təhsil alır.

Məlumat üçün onu da bildirək ki, I kurs tələbələrinin imtahanlarının test üsulu ilə, kompüter vasitəsilə aparılması üçün müvafiq treninqlər keçirilmişdir. Kredit sistemi artıq özünü tam doğrultmuş, imtahanların test üsulu ilə, kompüter vasitəsilə aparılması tələbələrin böyük razılığına səbəb olmuşdur. Universitetdə 5 kompüter imtahan zalı fəaliyyət göstərir. Həmin zallarda yerləşdirilmiş 200 kompüter vasitəsilə bir gündə 2500 nəfər tələbə imtahan verə bilir. İmtahanlara nəzarəti gücləndirmək üçün xüsusi kameralar quraşdırılmışdır. İmtahan zalında yanaşı oturan müxtəlif fakültələrin tələbələri ayrı-ayrı fənlərdən imtahan verirlər. Bu da onların bir-birinə kömək etmələrinin qarşısını alır. Nəzarətçi-müəllimlər də qeyri-ixtisas sahibləridir.

Universitetin Kompüter Mərkəzində VTS - test sistemi üzrə keçirilən imtahanlarda nəzarət qrupunun rəhbəri, dosent Yaşar Hüseynəliyev bizə bildirdi ki, 133 saylı otaqda 51 ədəd kompüter var və bu da gün ərzində həmin otaqda 360 nəfər tələbənin imtahan verməsinə imkan yaradır. İmtahanlar hər gün səhər saat 9:00-da başlayır və imtahan müddəti 45 dəqiqədir.

134 saylı otaqda da imtahanın gedişi ilə maraqlandıq. Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin III kurs tələbələri Aygül Təhməzova və Şəbnəm Rəhmanova imtahanların gedişindən çox razılıq etdilər. Bildirdilər ki, proses çox şəffaf və obyektiv gedir, savadlı, bilikli tələbələr heç bir çətinlik çəkmirlər. Çünki universitetdə tələbə-gənclər üçün əlverişli təhsil mühiti yaradılıb, eyni zamanda onlara təcrübəli alim və müəllimlər dərs deyirlər. İmtahanqabağı 34 bal, imtahanda isə 28 bal toplayaraq cəmi 62 bal toplayan A.Təhməzova biliyinin "kafi" qiymətləndirildiyini bildirdi.

135 saylı otaqda nəzarətçi-müəllim Zöhrə Salamova 20 nəfər tələbənin imtahan verdiyini və imtahanın normal keçdiyini söylədi. Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin III kurs tələbəsi Aynur Cabbarovanın göstəricisi ilə tanış olduq. "Bədii qrafika" fənnindən imtahanqabağı 40 bal, imtahanda isə 46 bal toplayan (cəmi 86 bal) tələbənin biliyi "yaxşı" qiymətləndirilmişdi. Pedaqogika fakültəsinin II kurs tələbəsi Asiman Salmanova cəmi 60 bal (imtahanqabağı 33 bal, imtahanda isə 27 bal) toplayaraq "kafi" qiymət almışdır.

Həmin fakültənin III kurs tələbəsi Bəyim Albalıyeva isə 65 bal topladığını və artıq 7-ci imtahanı verərək sessiyanı başa vurduğunu fərəhlə söylədi. I kurs magistri İsmayıl Fətəliyev də imtahanların obyektiv aparılmasından razılığını bildirdi.

Bu məlumatları əldə etdikdən sonra magistrların imtahanlarının gedişi ilə maraqlandıq. "Oxu zalı"nda 250 nəfər magistr 20 fənn üzrə imtahan verirdi. Bu barədə məlumat verən imtahan rəhbəri, dosent Fəxrəddin Yusifov bildirdi ki, magistrlar "psixologiya", "ali məktəb pedaqogikası", "qeyri-üzvi kimya", "Azərbaycan dilində söz yaradıcılığı" və sair fənlərdən sualları yazılı cavablandırırlar. Vaxt başa çatdıqdan sonra yazı işləri götürülüb kodlaşdırılır, ixtisas müəllimləri tərəfindən həmin gün yoxlanılıb dekanlığa məlumat verilir.

Öyrəndik ki, bütün imtahan rəhbərləri və nəzarətçi-müəllimlər öz öhdələrinə düşən vəzifələri layiqincə yerinə yetirirlər.

ADPU-da imtahan sessiyasının gedişi ilə bağlı təəssüratlarımızı universitet üzrə apelyasiya komissiyyasının sədri, Beynəlxalq əlaqələr üzrə prorektor, dosent Mehdi Abdulayevlə də bölüşdük. Bütövlükdə belə bir qənaətə gəldik ki, ADPU-da həyata keçirilən bütün bu tədbirlər imtahanların obyektiv və şəffaf keçirilməsinin təmin edilməsinə hesablanıb.

Yeri gəlmişkən, onu da qeyd edək ki, universitet daxilində, eləcə də tədris auditoriyalarında və imtahan zallarında yaradılmış nizam-intizam, səliqə-sahman da təqdirəlayiqdir. Bu da öz növbəsində universitetdə inzibati-təsərrüfat işlərinin günün tələbləri səviyyəsində təşkil edilməsindən xəbər verir.

Bunlarla yanaşı, ADPU-nun mühafizə xidmətinin baş mühafizəçisi Şamil Cəfərzadə, mühafizəçilər Əfqan Rəhimov, Vüsal Əliyev və Rəhman Aslanov universitetdə ictimai asayişin təmin edilməsi və daxili nizam-intizam qaydalarının lazımi səviyyədə qorunması üçün əzmlə çalışırlar.

**Mənsur QÜDRƏTOĞLU,**
**Gülnar BƏXTİYARQIZI**

**Oqtay Rza,**
**Əməkdar müəllim**

## Vətən, daha yas saxlama!

Azərbaycan! Dərdin böyük, yaran çox dərin-
Müsibəti gözü ilə görüb Tanrı da.
Səndən torpaq payı uman o xainlərin
Bir gün toza çevriləcək ağaları da!
Səndən ötrü süngülərə sinə gərmişik;
Vətən, daha yas saxlama, biz ölməmişik!

Sıramızda qoca, cavan, məktəbli qız var;
Sıramızda-ata, oğul, ağbirçək nənə...
Hər qırmızı qərənfildə al qanımız var,
Al qanımız hopub sübhün şəfəqlərinə.
Üstümüzdən tank keçsə də, əzilməmişik;
Vətən, daha yas saxlama, biz ölməmişik!

Neçə küçə, neçə bina qopardı fəryad,
Bakımızın harayına hay verdi Xəzər;
Azər, İlham, Yusif, İlqar, Yeganə, Fərhad...
İnsan idik, dönüb olduq abidə, əsər.
Hər bayatı-həzin layla, hər məzar-beşik;
Vətən, daha yas saxlama, biz ölməmişik!

Fəlakətdən min ay, min il ötəcək, fəqət
Yaddaşlarda, ürəklərdə yaşayacağıq.
Çilənir nur, ələnir gül, söylənir rəhmət".
Yağı yana-yana qalsın, bilsin ki, sağıq.
Biz silahsız vuruşaraq, qalib gəlmişik;
Vətən, daha yas saxlama, biz ölməmişik!

## İSGƏNDƏR HƏSƏN OĞLU CƏFƏROV



Azərbaycanın elm və təhsil ictimaiyyətinə ağır itki üz vermişdir. Fizika sahəsində tanınmış alim, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müxbir üzvü, fizika-riyaziyyat elmləri doktoru, professor, Əməkdar elm xadimi, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Nəzəri fizika kafedrasının müdiri İsgəndər Həsən oğlu Cəfərov 2015-ci il yanvar ayının 7-də 75 yaşında vəfat etmişdir.

İsgəndər Cəfərov 1940-cı il dekabr ayının 30-da İmişli rayonunun Əlipənahlı kəndində anadan olmuş və 1957-ci ildə rayonun Sarxanlı kənd orta məktəbini bitirmişdir. İ.Cəfərov Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) Fızika-riyaziyyat fakültəsinə daxil olmuş, 1962-ci ildə ali məktəbi fərqlənmə diplomu ilə başa vurmuş və həmin il M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin (MDU) Fizika fakültəsinin aspiranturasına daxil olmuşdur. İ.Cəfərov məşhur sovet fiziki A.A.Sokolovun elmi rəhbərliyi altında nəzəri fizika sahəsində tədqiqatlar aparmağa başlamış və 1966-cı ildə MDU-da "Polyarizələnmiş zərrəciklərlə aparılan təcrübələrdə kompleks elektromaqnit formfaktorlarının təyini və birfotonlu yaxınlaşmanın tətbiq hüdudunun müəyyənləşdirilməsi imkanları barədə" mövzusunda namizədlik dissertasiyası müdafıə etmişdir. Moskvada namizədlik dissertasiyası müdafiə edib Bakıya qayıtdıqdan sonra İ.Cəfərov Azərbaycan Politexnik İnstitutunun (indiki Azərbaycan Texniki Universiteti) Fizika kafedrasında baş müəllim kimi əmək fəaliyyətinə başlamış və 1969-cu ildə müsabiqə yolu ilə Azərbaycan SSR Elmlər Akademiyasının Fizika İnstitutunun Nüvə fizikası laboratoriyasında baş elmi işçi vəzifəsinə və tezliklə həmin laboratoriyanın müdiri vəzifəsinə seçilmişdir.

İ.Cəfərov 1979-cu ildə M.V.Lomonosov adına MDU-da "Kalibrlənən SU(2)xU(1)-modellər və elementar zərrəciklərin zəif qarşılıqlı təsiri" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. 1970-1985-ci illərdə İ.Cəfərov gərgin və məhsuldar elmi yaradıcılıqla yanaşı, BDU-da və Azərbaycan Dövlət Pedaqoji İnstitutunda (indiki ADPU) tələbələrə nəzəri fizikanın müxtəlif sahələri üzrə ümumi və xüsusi kurslardan mühazirələr oxumuşdur.

Görkəmli alim 1985-1989-cu illərdə Naxçıvan Dövlət Pedaqoji İnstitutunun (indiki Naxçıvan Dövlət Universiteti) rektoru, 1989-1995-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Fizika fakültəsinin dekanı, 1995-ci ildən ömrünün sonunadək isə ADPU-nun Nəzəri fizika kafedrasının müdiri vəzifələrində çalışmışdır.

İ.Cəfərov 2014-cü ildə fizika ixtisası üzrə AMEA-nın müxbir üzvü seçilmişdir.

Professor İ.Cəfərovun elmi tədqiqatlarının əsas qayəsini elektromaqnit və zəif qarşılıqlı təsirlərin vahid nəzəriyyəsi üzrə işlər təşkil edir. O, zərrəciklərin elektrozəif qarşılıqlı təsirlərinin SU(2)xU(1) və digər simmetriya qruplarına əsaslanan vahid nəzəriyyəsinin bir sıra variantını irəli sürmüşdür. İ.Cəfərov leptonların dördkomponentli neytrino sxemi üzrə vahid elektrozəif qarşılıqlı təsir nəzəriyyəsini yaratmışdır. Bundan başqa, İ.Cəfərov spontan pozulmuş SU(2)xU(1) kalibrləmə simmetriyası çərçivəsində neytrinonun kütlə qazanmasının mümkünlüyünü göstərmiş, müonun parçalanmasına aid təcrübi faktların nəzəri təhlili nəticəsində müon neytrinosu kütləsinin yuxarı sərhədinin o vaxtlar elmi ədəbiyyatda mövcud olan qiymətdən xeyli kiçik (0,22 MeV) olduğunu göstərmişdir. Görkəmli alim ulduzların neytrino şüalanmasını, təbiətdə mövcud olan neytrino növlərinin sayı ilə bagłı məsələləri, elektron-pozitron cütünün fotonun müşayiətilə neytrino-antineytrino cütünə annihilyasiyası prosesi vasitəsilə neytrinoların qeydə alınması imkanlarını, maqnit sahəsində elektron (pozitron) qazının neytrinolar tərəfindən asimmetrik qızdırılması və buradan irəli gələn astrofiziki nəticələri tədqiq etmiş və müxtəlif öncəgörmələr irəli sürmüşdür.

180-ə yaxın elmi əsərin müəllifi olan İ.Cəfərovun aldığı elmi nəticələr dünyanın elm və texnika sahəsində qabaqcıl ölkələrinin, həmçinin respublikamızın nüfuzlu elmi nəşrlərində çapdan çıxmış, həmin elmi əsərlərə dünyanın görkəmli alimləri çoxsaylı istinadlar etmişlər.

Professor İ.Cəfərov elementar zərrəciklər nəzəriyyəsi sahəsində elmi məktəb yaratmış, onun elmi rəhbərliyi və məsləhətçiliyi ilə 10-dan artıq doktorluq və namizədlik dissertasiyası müdafiə edilmişdir.

İ.Cəfərovun elmi və pedaqoji fəaliyyəti dövlət tərəfindən layiqincə qiymətləndirilmişdir. O, Naxçıvan Muxtar Respublikası Ali Sovetinin, Azərbaycan Respublikası Təhsil Nazirliyinin fəxri fərmanları, "Qabaqcıl təhsil işçisi" döş nişanı ilə, 2012-ci ildə isə Azərbaycan Respublikası Prezidentinin sərəncamı ilə "Əməkdar elm xadimi" fəxri adı ilə təltif edilmişdir.

İsgəndər müəllim qayğıkeş ailə başçısı olmuş, sadəliyi, təvazökarlığı, obyektivliyi, xeyirxahlığı, Vətənə, torpağa bağlılığı ilə işlədiyi və ünsiyyətdə olduğu insanların, dostlarının, yetirdiyi elmi kadrların, dərs dediyi tələbələrin rəğbətini qazanmışdır.

Tanınmış fizik alim, pedaqoq, elm və təhsil təşkilatçısı, səmimi insan İsgəndər Həsən oğlu Cəfərovun xatirəsi onu tanıyanların qəlbində həmişə yaşayacaqdır.

***Allah rəhmət eləsin!***

**Azərbaycan Milli Elmlər Akademiyası**
**Azərbaycan Dövlət Pedaqoji Universiteti**

*Azərbaycan Respublikası Prezidentinin 2015-ci il 19 yanvar tarixli Sərəncamı ilə təsdiq edilmişdir*

## "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı
## F Ə A L İ Y Y Ə T  P L A N I

| Strateji hədəflər | Tədbirlər | Tədbirin həyata keçirilməsi üçün zəruri əsaslar | İcra müddəti (illər üzrə) | İcraçılar |
|---|---|---|---|---|
| 1 | 2 | 3 | 4 | 5 |
| **1. Səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsilin məzmununun yaradılması** | | | | |
| 1.1. Uşaqların erkən yaş dövründə inkişafının səmərəli təhsil modelinə əsaslanan standartlarının və kurikulumların hazırlanması | 1.1.1. məktəbəqədər təhsil üzrə milli məzmun standartlarının hazırlanması və ekspertizası | | 2015 | Təhsil Nazirliyi |
| | 1.1.2. məktəbəqədər təhsil üzrə milli məzmun standartlarının təsdiqi | | 2015 | Nazirlər Kabineti |
| | 1.1.3. məktəbəqədər təhsil üzrə nümunəvi kurikulumların (o cümlədən məktəbə hazırlıq kurikulumunun) hazırlanması | | 2015 | Təhsil Nazirliyi |
| | 1.1.4. məktəbəqədər təhsil üzrə nümunəvi kurikulumlara dair təlimlərin təşkili, kurikulumların tətbiqi | milli məzmun standartlarının Nazirlər Kabineti tərəfindən təsdiqi, kurikulumların tətbiqi üçün maliyyə vəsaitinin ayrılması | 2016 | Təhsil Nazirliyi, yerli icra hakimiyyəti orqanları |
| | 1.1.5. "Səriştəli valideynlər" televiziya proqramının hazırlanması və həyata keçirilməsi | maliyyə vəsaitinin ayrılması | 2015-ci ildən başlayaraq | Təhsil Nazirliyi |
| 1.2. Səriştə əsaslı ümumi təhsil standartlarının və kurikulumlarının hazırlanması | 1.2.1. 12 illik ümumi təhsilin milli məzmun və qiymətləndirilmə standartlarının hazırlanması və ekspertizası | | 2015-2016 | Təhsil Nazirliyi |
| | 1.2.2. 12 illik ümumi təhsilin milli məzmun və qiymətləndirilmə standartlarının təsdiqi | 12 illik ümumi təhsilə keçidi təmin etmək məqsədi ilə müvafiq qanunvericilik aktlarında dəyişikliklərin edilməsi | 2016 | Nazirlər Kabineti |
| | 1.2.3. 12 illik ümumi təhsilin səviyyələri üzrə nümunəvi fənn kurikulumlarının hazırlanması | | 2016-2017 | Təhsil Nazirliyi |
| | 1.2.4. 12 illik ümumi təhsilin nümunəvi kurikulumları üzrə təlimlərin təşkili, kurikulumların tətbiqi | milli məzmun standartlarının Nazirlər Kabineti tərəfindən təsdiqi, kurikulumların tətbiqi üçün maliyyə vəsaitinin ayrılması | 2017-2021 | Təhsil Nazirliyi |
| | 1.2.5. dərslik hazırlığı sahəsində yeni qaydaların hazırlanması | | 2016-2017 | Təhsil Nazirliyi, Tələbə Qəbulu üzrə Dövlət Komissiyası |
| | 1.2.6. dərslik hazırlığı sahəsində yeni qaydaların təsdiqi | | 2017 | Nazirlər Kabineti |
| | 1.2.7. dərslik hazırlığı sahəsində yeni qaydaların tətbiqi | dərslik hazırlığı sahəsində yeni qaydaların təsdiqi, maliyyə vəsaitinin ayrılması | 2017 | Təhsil Nazirliyi |
| 1.3. Şəxsiyyətin, cəmiyyətin və dövlətin maraqları baxımından istedadın erkən yaşdan aşkar olunması, inkişafı və dəstəklənməsi üzrə sistemin yaradılması | 1.3.1. istedadlı uşaq və gənclərin inkişafı üzrə dövlət proqramının hazırlanması, təsdiqi və həyata keçirilməsi | istedadlı uşaq və gənclərin inkişafı üzrə dövlət proqramının təsdiqi, maliyyə vəsaitinin ayrılması | 2016-2024 | Nazirlər Kabineti, Təhsil Nazirliyi, İqtisadiyyat və Sənaye Nazirliyi, Gənclər və İdman Nazirliyi, Ədliyyə Nazirliyi, Mədəniyyət və Turizm Nazirliyi |
| 1.4. Sağlamlıq imkanları məhdud şəxslərin həyata və təhsil mühitinə inteqrasiyasını təmin edən inklüziv təlim metodologiyasının yaradılması | 1.4.1. sağlamlıq imkanları məhdud şəxslərin inkişafı və inklüziv təhsili üzrə dövlət proqramının hazırlanması, təsdiqi və həyata keçirilməsi | sağlamlıq imkanları məhdud şəxslərin inkişafı və inklüziv təhsili üzrə dövlət proqramının təsdiqi, maliyyə vəsaitinin ayrılması | 2015-2023 | Nazirlər Kabineti, Təhsil Nazirliyi, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi, Səhiyyə Nazirliyi, Ədliyyə Nazirliyi |

(Davamı 4-cü səhifədə)

